**UOT 638.132.2**

# MEYVƏÇİLİKDƏ MÜHİTƏ UYĞUN ÇƏYİRDƏKLİ MEYVƏ SORTLARININ SEÇİM PROBLEMİ VƏ ONUN ARIÇILIĞIN İNKİŞAFINA TƏSİRİ

**M.C.ƏLİZADƏ**
**AKTN Heyvandarlıq Elmi Tədqiqat İnstitutunun "Arıçılıq" Mərkəzi**

*Gəncə-Qazax bölgəsinin tədqiqat aparılan ərazisi relyefinin mürəkkəbliliyi, təbiətinin iqlim fərqi ilə sərhəd olduğu bölgələrdən seçilir. Ərazisinin çox hissəsi dağlar , dərələr və düzənliklərdən ibarətdir.*

*Tədqiqat aparılan ərazidə bağlarda aşağıdakı formasiyalara rast gəlinir: albalıq, gilaslıq, əriklik, şaftlılıq, gavalılıq və s. Bu bağlarda isə ekoloji təmiz keyfiyyətli, standartların tələblərinə uyğun meyvə istehsalında bal arılarında bağların tozlandırılmasında istifadə olunur ki, bu da 10-15% əlavə məhsul artımına səbəb olur.*

***Açar sözlər: bal** arısı, nektar, balverən çəyirdəkli meyvə bitkiləri, ərik, şaftalı, gavalı, albalı, gilas*

Bəşər tarixində insanların, heyvanların, eləcə də arıların həyatına, məişətinə daxil olan, biosferin bir hisəsini təşkil edən, onun inkişafında və mühafizəsində, xüsusilə də təbiətdə maddələr mübadiləsində əvəzsiz rol oynayan bağ qədər yaxından iştirak edən ikinci bir təbiət sərvəti bizcə yoxdur, olsa da çox azdır. İnsanlar həyatı boyu təbiətin yaratdığı bu qiymətli sərvətlə, bənzərsiz nemətlərilə maraqlanmış, onların öyrənilməsində, mühafizəsində, toplanmasında müasir texnologiyalar əsasında becərilməsində öz qüvvəsini əsirgəməmişdir.[1] Ümumiyyətlə, arı həyatının bütün tarixi mərhələlərində formalaşmış meşə-bağ-çəmən böyük əhəmiyyət kəsb etmişdir.

Bu gün ölkəmizdə qeyri – neft sektorunun inkişafı ilə bağlı ölkə Prezidentinin müxtəlif dövrlərdə imzaladığı Fərman və Sərəncamlarında aqrar sektorun ayrı-ayrı sahələrində olduğu kimi, meyvəçiliyin inkişafında arıçılığın rolu, arıçılığın inkişafında meyvə bağlatının rolu da bu günkü və gələcək inkişafında öz yerini əhəmiyyətli dərəcədə tapmışdır [3]. Meyvəyə və arı məhsullarına olan daxili tələbatın ödənilməsində, eləcə də xaricə satışından faydalanmaq, yəni, respublikamıza valyuta axınını çoxaltmaq məqsədilə meyvə və arı məhsullarının həcminin ilbəil artırılmasında yüksək məhsuldarlığa malik müxtəlif meyvə növlərinin sort-formalarının, eləcə də yerli arı populyasiyalarının yaradılması və mühafizəsi, saxlama zamanı saxlanma üsulu və rejimlərindən asılı olmayaraq müxtəlif miqdarda itkilərə məruz qalması bu günümüzün aktual problemləri sırasında özünə yer etmişdir. Ona görə də mövcudluq formasından asılı olmayaraq yaranmış iqtisadi vəziyyətdə tətbiq edilən yüksək texnologiyalar əsasında minimal qulluqla kifayət qədər yüksək keyfiyyətli bol məhsul verən və arıçılığın da inkişafında güclü yem bazasının formalaşmasına səbəb ola bilən adaptiv meyvə bitkilərinin və onların sortlarının seçim problemi həmişə ön planda aktuallıq kəsb edir. Şaxtalara, quraqlığa, xəstəliklərə və eyni zamanda xarici mühitin digər fövqəladə amillərinə davamlı sort–formalar da öz növbəsində çox əhəmiyyətlidirlər və müasir intensiv texnologiyaların inkişafından tam istifadəyə şərait yaradırlar.

Erkən yazda toz və nektar vermə qabiliyyətli çəyirdəkli meyvə bitkilərindən olan albalı, gilas, şaftalı, ərik və gavalının mövcud sortlarının potensial məhsuldarlıq imkanlarının aşkara çıxarılmamasındakı çətinliklər müəyyən dərəcədə bağlara edilən aşağı səviyyəli aqrotexniki qulluq əsasında sort-formaların genetik tələbatının ödənildiyi ekoloji şəraitə və onların yayılmasının iqtisadi imkanlarına müvafiq olması səbəbindəndir.

Buna görə də arıçılığın yem bazasının təşkilində, balverən özülün yaradılmasında böyük əhəmiyyət kəsb edən bağçılıqda seleksiya materialına aqrobioloji qiymət vermədə, həmçinin, stabil və keyfiyyətli məhsul almağa yönəlmiş xüsusi yetişmə şəraitində müxtəlif genotiplərin adaptivlik potensialının faydalı artırılması müasir aqronomiyada, o cümlədən, əkinçiliyin digər tərkib hissəsi olan meyvəçilikdə və heyvandarlıqda (arıçılıqda) yeni yanaşma üsullarına ehtiyac yaradır.

Təəssüflə qeyd etmək lazımdır ki, müxtəlif balverən çəyirdəkli meyvə cinslərinin yeni və introduksiya olmuş sort-formalarının əlverişsiz abiotik və biotik amillərə dayanıqlığının kifayət qədər öyrənilməməsi səbəbindən səmərəli və effektiv aqroiqlim paylanması ilə bağlı çətinlikər baş qaldırır. Bu barədə dünya meyvəçiliyində bir sıra bir-birinə bənzər və fərqli məqalələr bu günümüzədək dərc olunmaqda davam edir.

Keyfiyyətcə ekoloji təmiz kənd təsərrüfatı məhsulları istehsalında bazarın istehlak zərurəti ilə yaranan ehtiyac tələbi nəticəsində respublikamız üçün biotik və abiotik xarakterli bir sıra xarici mühit (iqlim) amillərinin təsirinə davamlı balverən çəyirdəkli meyvə bitkilərinin sort-formalarının daha

tez çiçəkləyib bara düşən, güclü çiçəkləmə qabiliyyətli, xəstəlik və zərərvericilərə qarşı dözümlü olan müasir çəyirdəkli meyvə calaqaltılarının mövcudluğunun yaradılması əsasında xüsusi meyvəçiliyin, onun da əsasında hər iki sahənin - meyvəçilik və arıçılığın inkişafı xüsusi önəm daşıyır.

Tədqiqat obyekti olaraq seçdiyimiz balverən özüldə çəyirdəkli meyvə bitkilərində kəmiyyətcə ifadə olunmuş xarici mühitin təsirini bilmək az və ya çox dəqiqliklə öyrənilən bu bitkilərin əsas növ və sort xüsusiyyətlərini müəyyən etməyə verilmiş zaman müddətində məlum mühitə bitkinin konkret reaksiyasını aşkar etməyə imkan verir.

Balverən özüldə çəyirdəkli meyvə ağaclarının becərilməsində xarici mühit şəraiti haqda bilgilərlə bərabər alçaqboylu gec çiçəkləyən, tez yetişən və arıların hesabına suni tozlama yolu ilə keyfiyyətli məhsul verə biləcək mövcud sortların seçilməsi də vacib əhəmiyyət daşıyır. Ümumiyyətlə, kənd təsərrüfatı məhsulları istehsalında (meyvə, bal və s.) bir vasitə kimi sort -formanın rolunu həddən artıq qiymətləndirmək çətindir. Baxmayaraq müvafiq sort-formaların mövcudluğu hər hansı bir meyvə növünün becərilmə texnologiyasını təkmilləşdirməyə, mövcud və salınacaq bağların iqtisadi effektivliyini əhəmiyyətli dərəcədə artırmağa imkan verir. Buna görə də seleksiyaçılar daim yeni meyvə və giləmeyvə sortları yaratmalıdırlar. Bununla belə sortdəyişmənin təkmilləşmə həddi də yoxdur. Bu, bir fasiləsiz prosesdir. Belə ki, zaman keçdikcə sort-formalara ehtiyac tələbatı dəyişir, yeni seleksiya ideyaları yaranır və sadəcə olaraq istənilən sort-formada həmişə elə əlamət tapılır ki, onu yaxşılaşdırmaq lazım gəlir. Həm də qeyd edilməlidir ki, bağçılıqda seleksiya işi kifayət qədər mürəkkəb prosesdir. Bir qayda olaraq uzun vaxt aparır, kifayət qədər baha başa gəlir. Yeni sort-formaların yaradılmasında istifadə edilən ideyalar isə diqqətlə qorunur və mühafizə edilir.

Azərbaycan Respublikasının istehsalatında istifadə üçün nəzərdə tutulan rayonlaşdırılmış və perspektiv meyvə sortları Dövlət reysterinə görə meyvə və giləmeyvə bitkilərinin paylanması aqroiqlim göstəricilərinə görə bir-birindən əhəmiyyətli dərəcədə fərqlənən 10 region üzrə aparılır. Amma, yaddan çıxartmaq olmaz ki, yeni yaradılan və introduksiya olunmuş balverən çəyirdəkli meyvə sortlarının əlverişsiz abiotik amilərə davamlılığının, yaxud da tolerantlığının yetərincə öyrənilməməsi ilə əlaqədar olaraq onların səmərəli və effektiv aqroiqlim ehtiyatlarının paylanmasında və istifadəsində çətinliklər mövcuddur. Ona görə də bu yönümlü tədqiqatların aparılması praktik arıçılığa, sənaye bağçılığına çox böyük fayda gətirə bilər. Və eyni zamanda arı ailələrinin vərəmum, çiçək tozu, arı zəhəri, nektar toplaması və bağlarda bar vermənin davamlılığının bütün balverən çəyirdəkli meyvə cinslərinin, xüsusilə də yeni və introduksiya olunmuş sort-formalarının, bioloji resurslarının qiymətləndirilməsi ilə sıx qarşılıqlı əlaqədə hərtərəfli araşdırılmasına yönəlmiş kompleks elmi-tədqiqatların aparılmasını aktuallaşdırır.

Bu məqsədlə, 2011-2017-ci illərdə apardığımız çoxillik fenoloji müşahidələrin və tədqiqatların nəticələri göstərmişdir ki, çəyirdəkli meyvə bitkilərinin müxtəlif sort-formaları ilk baharda fərqli vaxtlarda tumurcuqların şişməsi başlayır, ondan sonra da çiçəkləyir. Onu da qeyd etmək lazımdır ki, tumurcuqların açma anında da arılar çiçək tumurcuğundakı ifraz edilən şirədən də istifadə edirlər.

Çiçəkləmə yazda yağmurlu, soyuq, rütubətli, küləkli günlərdə başlayarsa bu hal arıçılıqda arzuolunmaz hal kimi dəyərləndirilir. Bu halın əksi baş verən zaman həm arıxanaların yaxınlığındakı bağlarda tozlanma yaxşı getdiyindən mayalanma əmsalı yüksək olur. Və eyni zamanda bal arıları nektar və çiçək tozu gətirməkdə çətinlik çəkmir. Bu da nəticə etibarı ilə bağlarda keyfiyyətli və bazar tələbatını ödəyəcək məhsul artımına, arıçılıqda isə ağaclardan gətirilən çiçək tozunun çoxluğuna görə ana arı daha çox yumurta qoyur. Beləliklə də, işçi arıların sayca artımına səbəb olur.

Cədvəl 1-dən aydın görünür ki, araşdırılan hər bir sort –biologiyasından, bitdiyi bölgənin torpaq-iqlim şəraitindən asılı olaraq çiçəkləyir və bu fazadan sonra meyvələrin inkişafı fazası başlayır. Yaxşı tozlanmış çiçəklərdə mayalanma da yaxşı gedir, meyvələrin inkişafı da sürətli olur. Çiçək - arı qarşılıqlı əlaqəsi çiçəkləmə dövrünə təsirsiz qalsa da, məhsuldarlığın yüksəlməsinə və məhsuldarlıq elementlərinin formalaşmasına və ş. səbəb olur. Cədvəl 1-dən

**Cədvəl 1**

**Çəyirdəkli meyvə bitkilərinin çiçəkləməsi**

| s/s | Növün adı | Sortun adı | Ç i ç ə k l ə m ə | | | Mayalanma |
|---|---|---|---|---|---|---|
| | | | Başlanması | Kütləvi | Sonu | |
| 1 | Albalı | Anadolu | 05.04-07.04 | 11.04-13.04 | 15.04-17.04 | 12.04 -16.04 |
| | | Şpanka | 06.04-08.04 | 11.04-14.04 | 15.04-18.04 | 15.04-17.04 |
| | | Podbel | 05.04-07.04 | 11.04-13.04 | 15.04-17.04 | 12.04-16.04 |
| 2 | Gilas | Sarı Droqan | 10.04-15.04 | 20.04-22.04 | 28.04-30.04 | 21.04-29.04 |
| | | Krım | 11.04-16.04 | 22.04-24.04 | 28.04-30.04 | 23.04-27.04 |
| | | Kəl ürəyi | 11.04-16.04 | 22.04-24.04 | 28.04-30.04 | 23.04-28.04 |
| 3 | Ərik | Şalax | 15.03-17.03 | 20.03-22.03 | 01.04-03.04 | 23.03-01.04 |
| | | Qırmızıyanaq | 15.03-17.03 | 20.03-25.03 | 01.04-03.04 | 23.03-01.04 |
| | | Badam ərik | 12.03-14.03 | 18.03-24.03 | 28.03-30.03 | 19.03-28.03 |
| 4 | Şaftalı | Fədai | 20.03-22.03 | 25.03-27.03 | 29.03-31.03 | 26.03-28.03 |
| | | Qızıl yubiley | 20.03-22.03 | 25.03-27.03 | 29.03-31.03 | 26.03-28.03 |
| | | Elbert | 25.03-28.03 | 01.04-03.04 | 06.04-08.04 | 02.04-05.04 |
| 5 | Gavalı | Anna Şpet | 10.04-12.04 | 14.04-15.04 | 19.04-22.04 | 13.04-18.04 |
| | | Persikova | 05.04-07.04 | 10.04-13.04 | 17.04-20.04 | 11.04-16.04 |
| | | Yaşıl renklod | 08.04-10.04 | 12.04-14.04 | 18.04-20.04 | 13.04-17.04 |

görünür ki, ən tez çiçəkləmə Şalax, Qırmızıyanaq, Badam ərik sortlarında, ən gec isə Sarı Droqan, Krım, Kəl ürəyi gilas sortlarında müşahidə edilir. Arı ailələri üçün şərt təkcə sortların çiçəkləməsi deyil, önəmli hallardan biri də odur ki, ağacların çiçəklənməsi nə qədər növbə ilə ardıcıl baş verərsə bu, arı ailələrinin onlar üçün faydası çox böyük olan nektar və çiçək tozu ilə təmin edilməsi deməkdir.

Yuxarıda sadalanan şərtlər əsasında demək olur ki, ağaclarda kütləvi çiçəkləmə zamanı nektar vermə maksimum həddə çatır. Aparılan tədqiqatlar və təhlillər zamanı o qənaətə gəlinir ki, nektar dalınca arı axını bağlarda bitkilərin tozlanma əmsalını yüksəltməklə yanaşı, ümumi məhsuldarlığı da 10-15% artırır, məhsulun keyfiyyətini yüksəldir. Ona görə də bağçılıqda arı ailələrindən istifadə fermerlər üçün daha faydalı təkliflərdən biridir.

**ƏDƏBİYYAT**

1. Quliyev Ə.M. Azərbaycanın bal verən bitkiləri Bakı, Azərnəşr, 1958-ci il. 2. Каилацкий В.И., Логинов Г.В. Пчеловодство. Ростов - на Дону: "Феникс" 2013. 3. "Milli iqtisadiyyat və iqtisadiyyatın əsas sektorları üzrə " Strateji yol xəritəsi. 4. Seyidov A.K. Azərbaycanda arıçılığı inkişafa aparan yollar "Arıçılığın inkişafına dair Azərbaycan - Türkiyə elmi- tədqiqat əməkdaşlığı " və Azərbaycan Respublikası Kənd Təsrrüfatı Nazirliyi Aqrar Elm Mərkəzinin Gənc Alimlər Şurasının Beynəlxalq Toplantısı -II Konfransının materialları, 2015-ci il. 5. Sultanlı Q. Arıçılıq. Bakı, "Azərnəşr", 2001. 6. Z. Həsənov, C. Əliyev Meyvəçilik. Bakı: MBM nəşriyyatı, 2011, 515 s.

**Проблема выбора косточковых сортов в плодоводстве подходящее окружающей среде и ее влияние на развитие пчеловодства**

**М.Д.Ализаде**

Территория Гянджа - Газахского региона, на которой проводятся исследования, отличается среди приграничных районов сложностью рельефа и природным климатом. Большая часть его территории состоит из гор, долин и равнин.

На исследуемой территории в садах встречаются следующие формации: черешни, вишни, абрикоса, персика, сливы и т.д. При выращивании в данных садах экологически чистых по качеству и соответствующих современным стандартам фруктов используется метод опыления медоносной пчелы что способствует повышению урожайности на 10-15%.

***Ключевые слова:*** *медоносная пчела, нектар, медоносные фруктовые растения, абрикос, персик, слива, черешня, вишня.*

**The selectıon problems of the stone fruıt varıetıes according to the environment and their ınfluence to the development of beekeepıng**

**M.J.Alizade**

*The area of Ganja-Gazakh region is distinguished with the complexity of its relief and the climate differences of its nature from border areas. The big parts of area are the mountains, valleys and plains. In the area covered by the research, the following forms are found in the orchards: cherry, apricot, peach, plum groves, etc. In ecologically clean high quality high standart fruit production the honey bees are used in pollonation in these orchards which leads to an additional 10-15% increase in the productivity.*

***Key words:*** *honey bee, nectar, honey-producing fruit crops, apricots, peaches, plums, cherries.*